**UOT: 339.5**

# AZƏRBAYCANDAN POMİDOR İXRACININ MÖVCUD VƏZİYYƏTİNİN QİYMƏTLƏNDİRİLMƏSİ

**S.İ.VƏLIYEVA**
**AKTN Aqrar Tədqiqatlar Mərkəzi**

*Azərbaycan Respublikası 2017-ci ildə dünya üzrə pomidor ixracını sürətlə artıran ölkələrin siyahısına liderlik etmiş və bu sahədə ən çox gəlir əldə edən 15 ölkə arasında 13-cü yerdə qərarlaşmışdır. Qlobal pomidor ixracında 1,7 faiz bazar payı sahiblənən ölkəmiz, həm də Rusiyaya ən çox pomidor ixrac edən ölkə statusunu qazanmışdır. Bu artıma paralel olaraq Azərbaycanın qeyri-neft sektoru üzrə ixracında da pomidor birinci məhsul olmuşdur. Belə ki, 2017-ci ildə Azərbaycanın qeyri-neft sektoru üzrə ixracının 9,9 faizini pomidor ixracı təşkil etmiş, dəyəri (61 faiz) və həcmi (52 faiz) artmışdır. Ölkəmizdə pomidor ixracının artması ilə bağlı müsbət tendensiya ilə yaşansa da Rusiya bazarından asılılıq müəyyən təhlükələrdən də xəbər verir. Müəllif də bu məqalədə ölkədə pomidor ixracının mövcud vəziyyətini qiymətləndirir, ixracın artırılması və şaxələndirilməsi ilə bağlı müvafiq təkliflər verir.*

***Açar sözlər:*** *qeyri-neft sektoru, meyvə-tərəvəz, pomidor, ixrac, idxal, rəqabətqabiliyyəti.*

Azərbaycan Respublikasında 2017-ci və 2018-ci illərdə qeyri-neft sektoru üzrə ixracında birinci məhsul tomat (pomidor) olmuşdur. Belə ki, 2017-ci ildə Azərbaycanın qeyri-neft sektoru üzrə ixracının 9,9 faizini, 2018-ci ildə isə 10,5 faizini pomidor təşkil etmişdir(4). 2016-cı illə müqayisədə 2017-ci ildə pomidor ixracı dəyər baxımında 61 faiz, həcm baxımından 52 faiz artmışdır. Bu müsbət tendensiya 2018-ci ildə də davam etmiş və 2017-ci illə müqayisədə pomidor ixracı dəyər baxımından 17 faiz, həcm baxımından isə 12 faiz artmışdır. Azərbaycan ilk dəfə 2018-ci ildə 177 milyon ABŞ dolları dəyərində 172 min ton pomidor ixrac etmişdir (4). Amma pomidor ixracının bu şəkildə artmasına baxmayaraq ölkəmiz əsasən Rusiya bazarından asılı vəziyyətə düşmüşdür. Məhz bu məqalədə də qeyri-neft sektoru üzrə ixracda mühüm paya sahib olan pomidor ixracı ilə bağlı mövcud vəziyyət təhlil edilir və bu istiqamətdə həyata keçirilən siyasətin təsiri qiymətləndirilir. Həmçinin pomidorun ixrac bazarlarının şaxələndirilməsi ilə bağlı müvafiq təkliflər də verilir.

**Azərbaycanda qeyri-neft sektoru üzrə ixracın qısa xülasəsi.** 2018-ci ildə Azərbaycan Respublikasının hüquqi və fiziki şəxsləri dünyanın 113 ölkəsinə məhsul ixrac etmişlər. 2018-ci ildə qeyri-neft məhsullarının ixracı 1689,2 milyon ABŞ dolları təşkil etmişdir (5). 2017-ci ilə nisbətən qeyri-neft sektoru üzrə ixrac faktiki qiymətlərlə 9,8 faiz, real ifadədə isə 1,0 faiz artmışdır. 2018-ci ildə Azərbaycandan ixrac olunan kənd təsərrüfatı məhsullarının həcmi 593 milyon ABŞ dolları olmaqla 2017-ci ilə nəzərən 12,5 faiz artmışdır. Aqrar-sənaye məhsullarını ixracı isə 112 milyon ABŞ dolları təşkil etmiş və 2017-cü illə müqayisədə 14,8 faiz azalmışdır.

2018-ci il ərzində 2017-cı ilin eyni dövrü ilə müqayisədə təzə meyvə ixracı 22,4 faiz, təzə tərəvəz – 1,6 faiz, kartof – 15,6 faiz, bitki yağları – 14,2 faiz, meyvə və tərəvəz konservləri – 12,2 faiz, təbii üzüm şərabları və üzüm suslosu – 1,8 dəfə, pambıq lifi – 2,4 dəfə, pambıq ipliyi – 35,0 faiz artmışdır(4).

2017-ci illə müqayisədə 2018-ci ildə meyvə-tərəvəz ixracı 559,6 milyon ABŞ dolları təşkil etmiş və 11 faiz artmışdır. Belə ki, 2018-ci ildə meyvə-tərəvəz ixracı qeyri-neft sektoru üzrə ixracda 35,3 faizlik paya sahib olmuşdur.

2018-ci ildə qeyri-neft məhsullarının 36,7 faizi (619,2 milyon ABŞ dolları) Rusiya Federasiyasına ixrac edilmişdir(4). Rusiya Federasiyasına ixrac edilən qeyri-neft məhsullarının içərisində də əsas paya kənd təsərrüfatı məhsulları sahib olmuşlar. Təkcə bir faktı qeyd etmək kifayətdir ki, 2018-ci ildə Rusiyaya 176,3 milyon ABŞ dolları dəyərində pomidor ixrac edilmişdir. Bu isə Azərbaycanın cəmi pomidor ixracının 99,4 faizinə bərabərdir. Ümumiyyətlə, 2017-ci ildə Azərbaycandan ixrac olunan pomidorun 99,7 faizi, 2018-ci ildə isə 99,4 faizi Rusiyanın payına düşmüşdür.

**Azərbaycanda pomidor ixracının mövcud vəziyyəti.** Son iki ildə pomidor Azərbaycanda qeyri-neft sektoru üzrə ixracda birinci yerdə qərarlaşmışdır. Belə ki, 2017-ci ildə 151,6 milyon ABŞ dolları dəyərində, 2018-ci ildə isə 177,4 milyon ABŞ dolları dəyərində tomat ixrac olunmuşdur. 2018-ci ildə 2017-ci illə müqayisədə pomidor ixracı dəyər baxımından 17 faiz, həcm baxımından isə 12 faiz artmışdır.

Təhlillər göstərir ki, son 5 ildə Azərbaycandan pomidor ixracı davamlı olaraq artmışdır. Belə ki, 2014-ci ildə 49 milyon ABŞ dolları olan pomidor ixracı 2018-ci ildə 3,6 dəfə artaraq 177,4 milyon ABŞ dollarına çatmışdır(4). Nəticədə pomidor 2018-ci ildə də qeyri-neft sektoru üzrə ən çox ixrac edilən məhsul statusunu qorumuşdur.




**Şəkil 1.** Azərbaycan Respublikasından pomidor ixracı (4)

Apardığımız araşdırma göstərmişdir ki, Azərbaycan pomidoru da əsasən Rusiyaya Federasiyasına ixrac edilir. Belə ki, 2017-ci ildə pomidorun 99,7 faizi, 2018-ci ildə isə 99,4 faizi Rusiya Federasiyasına ixrac edilmişdir. 2017-ci ildə Azərbaycan Rusiyaya ən çox pomidor ixrac edən ölkə olmuşdur.

Aylar üzrə ixracat məlumatları onu göstərir ki, pomidor ixracatında əsas paya istixanalar malikdir. Çünki 2018-ci ildə ən çox pomidor ixracı may və iyun ayında reallaşmışdır. Bununla yanaşı ölkədə istixanaların inkişafı nəticəsindən oktyabr, noyabr dekabr və yanvar aylarında da pomidor ixracı həyata keçirilmişdir. Şəkil 2-dən də göründüyü kimi xüsusən yay aylarında iyul, avqust və sentyabrda pomidor ixracı digər aylarla müqayisədə az olmuşdur.




**Şəkil 2.** 2018-ci ildə aylar üzrə pomidor ixracı (4)

Həmçinin ixrac olunan pomidorun qiyməti də aylar üzrə dəyişmişdir. Belə ki, 2018-ci ilin mart ayında 1 kq pomidor 1,24 ABŞ dollarına ixrac olunmuşdursa, həmin ilin avqust ayında bu məbləğ 0,80 və sentyabr ayında 0,79 ABŞ dolları təşkil etmişdir. 2018-ci il üzrə ixrac edilən pomidorun orta qiyməti isə 1,03 ABŞ dolları olmuşdur. Bu isə 2017-ci il üzrə ixrac edilən pomidorun orta qiymətindən 0,04 ABŞ dolları çoxdur.




**Şəkil 3.** 2018-ci ildə aylar üzrə pomidor ixracı, 1 kq üçün ABŞ dolları ilə (4).

Ümumiyyətlə, son 5 ildə ixrac edilən pomidorun orta ixrac qiyməti artmışdır. Belə ki, 2013-cü ildə ixrac edilən pomidorun orta qiyməti isə 0,88 ABŞ dolları idisə, 2018-ci ildə bu rəqəm 0,15 ABŞ dolları artaraq 1,03 ABŞ dollarına çatmışdır.

Pomidor ixracı ilə bağlı apardığımız araşdırma göstərir ki, Azərbaycanın bu məhsulu Rusiya bazarında rəqabətqabiliyyətlidir. Daxili Resurs Xərci (DRC) əmsalı üzrə hesablamalar göstərir ki, növbəti illərdə də pomidor daxili və xarici bazarda rəqabətqabil olacaqdır(2). Lakin pomidor ixracının ancaq Rusiya bazarından asılı olmasının təhlükələrinin də olduğunu nəzərə almalıyıq. Belə ki, Rusiyanın hər hansı səbəbdən bu məhsulun öz ərazisinə idxalına məhdudiyyət qoyarsa Azərbaycanın pomidor ixracatçıları ciddi zərərə uğraya bilərlər. Onun üçün respublikada bu məhsulun emalının dərinləşdirilməsi və ixracının şaxələndirilməsi istiqamətində təxirəsalınmaz tədbirlərin görülməsi vacibdir. Məhz Prezidenti İlham Əliyev də "Azərbaycan Respublikası regionlarının 2014-2018-ci illərdə sosial-iqtisadi inkişafı Dövlət Proqramı"nın icrasının dördüncü ilinin yekunlarına həsr olunan konfransda "Keçən il pomidor ixracı rekord həddə çatıb, ölkəyə 151 milyon dollar valyuta gəlib. Buna da böyük tələbat, böyük maraq var. Ancaq yenə də deyirəm, 400 hektarda salınan bu istixanaların hamısında pomidor yetişdiriləcəksə, bəlkə bu qədər bazar da tapmaq çətin olacaq. Ona görə həm dövlət qurumları, həm sahibkarlar özləri marketinq aparsınlar. Bazarların marketinqini aparsınlar ki, harada nə satmaq olar, harada hansı məhsullar üçün daha böyük tələbat var və hansı ölkələrdə daxili istehsal artır. Biz onu da həmişə yadda saxlamalıyıq ki, əgər indi

ənənəvi bazarımız olan ölkələrdə daxili istehsal bu və digər məhsullar üzrə artırsa, deməli, ixracımız üçün problem yarana bilər" deyərək bu istiqaməti iş aparılması ilə bağlı müvafiq dövlət qurumlarına göstəriş vermişdir(3).

**3.Dünya üzrə pomidor ixracı və Azərbaycanın bu bazarda yeri**

Beynəlxalq Ticarət Mərkəzinin statistik məlumatlarına əsasən 2017-cı ildə pomidor ixracında qlobal satış 8,9 milyard ABŞ dolları həcmində qiymətləndirilir. 2016-cı ildən 2017-ci ilə qədər pomidor ixracından gəlirlər 3% artmışdır(9). 2017-ci ildə pomidor ixracının 49,1%-i, dəyər ilə ifadə etsək, 4,49 milyard ABŞ dolları Avropa ölkələrinin payına düşmüşdür. 2017-ci ildə qlobal pomidor ixracatı bazarının 30,3%-i Şimali Amerikanın, 12,2%-i Asiya regionunun, 7,8%-i isə Afrika ölkələri ixracatçılarının payına düşmüşdür. 2017-ci ildə Azərbaycan da pomidor ixracatı bazarında kifayət qədər yüksək bazar payına sahib olmaqla, bu sahədən çox gəlir əldə edən 15 ölkə arasında 13-cü yerdə qərarlaşmışdır. Onu da, qeyd etmək lazımdır ki, 2017-ci ildə respublikamızın qlobal pomidor ixracında bazar payı 1,7 faiz olmuşdur.

***Cədvəl 1.***

**Dünya üzrə pomidor ixrac edən əsas ölkələr**

| Sıra | Ölkələr | İxrac həcmi, mln ABŞ dollar | Bazar payı, % |
|---|---|---|---|
| 1 | Hollandiya | 2000 | 22.2 |
| 2 | Meksika | 1900 | 21.9 |
| 3 | İspaniya | 1100 | 12.7 |
| 4 | Mərakeş | 578 | 6.5 |
| 5 | Kanada | 416 | 4.7 |
| 6 | Fransa | 374 | 4.2 |
| 7 | ABŞ | 334 | 3.8 |
| 8 | Belçika | 304 | 3.4 |
| 9 | Türkiyə | 290 | 3.3 |
| 10 | İordaniya | 223 | 2.5 |
| 11 | Çin | 218 | 2.4 |
| 12 | İtaliya | 157 | 1.8 |
| 13 | Azərbaycan | 155 | 1.7 |
| 14 | Polşa | 66 | 0.7 |
| 15 | Portuqaliya | 61 | 0.7 |

**Mənbə:** **www.worldstopexports.com/tomatoes-exports-country/**

Cədvəldə qeyd edilən bu 15 ölkə 2017-ci ildə dünya üzrə pomidor ixracının 92,5 faizini reallaşdırmışdır. 2013-cü ildən etibarən pomidor ixracını sürətlə artıran ölkələr isə Azərbaycan, Çin, Portuqaliya, Mərakeş və Hollandiya olmuşdur. Azərbaycan bu siyahıya liderlik etmişdir.

Qlobal miqyasda pomidor ixracında mövqeləri geriliyən ölkələr isə Polşa, İtaliya, İordaniya, Türkiyə və İspaniya olmuşdur. Xüsusən də Türkiyənin Rusiya ilə yaşadığı problemlər bu ölkənin Rusiya bazarındakı liderliyin itirməsinə səbəb olmuşdur. Buna paralel olaraq Azərbaycan isə Rusiya bazarında birinciliyi ələ almışdır.

Şəkildən də göründüyü kimi 2017-ci ildə Azərbaycan 28 faizlik payla Rusiyaya ən çox pomidor ixrac edən ölkə olmuşdur. Azərbaycanın əsas rəqibləri isə 24 faizlik payla Çin və 23 faizlik paya sahib olan Mərakeşdir. Amma 2017-ci ilin sonundan etibarən Rusiya Türkiyə pomidorun idxalına qoyduğu qadağanı götürmüşdür. Bu isə ondan xəbər verir ki, 2019-cu ildə Türkiyənin də qatılması ilə Rusiyanın pomidor bazarında rəqabət kəskinləşəcəkdir.




**Şəkil 4.** 2017-ci ildə Azərbaycanın Rusiya bazarında payı, faizlə(8)

**Azərbaycanda pomidorun istehsalının və ixracının artırılması imkanları.** Azərbaycan Respublikası Dövlət Statistika Komitəsinin məlumatlarına əsasən 2017-ci ildə Azərbaycanda 615 min ton pomidor istehsal edilmişdir. İstehsal olunan pomidorun 154 min tonu və ya 25 faizi ixrac edilmişdir.




**Şəkil 5.** Azərbaycanda Pomidor istehsalı və ixracı, min ton(4;7)




**Şəkil 6.** Azərbaycanda pomidor istehsalının strukturu, min ton(4;7)

DSK-nın məlumatlarının təhlilindən aydın olur ki, son 5 ildə pomidor istehsalı 23 faiz artmışdır. Xüsusən də ölkəmizdə istixana şəraitində pomidor istehsalında ciddi artım baş vermişdir. Belə ki, dövlət

tərəfindən yeni aqroparkların və istixanaların yaradılmasının təşviq edilməsi bu sahədə inkişafa səbəb olmuşdur. Son illərdə regionlarda və Bakı şəhərinin qəsəbələrində 312 hektar sahədə ümumi dəyəri 400 milyon manat olan 58 müasir istixana kompleksinin yaradılmasına İqtisadiyyat Nazirliyinin Sahibkarlığa Kömək Milli Fondu tərəfindən 200 milyon manat güzəştli kredit verilmişdir(6).

Şəkildən də göründüyü kimi Azərbaycanda pomidor istehsalının strukturunda istixanaların xeyrinə dəyişiklik baş vermişdir. Əgər 2013-cü ildə ölkədə istehsal olunun pomidorun ancaq 7 faizi istixanaların payına düşürdüsə 2017-ci ildə bu vəziyyət dəyişmiş və istixanalarda pomidor istehsalı ciddi şəkildə artmışdır. DSK məlumatlarının təhlilindən aydın olur ki, 2017-ci ildə ölkədə istehsal olunan pomidorun 49 faizi və ya 303 min tonu istixanaların payına düşmüşdür. Növbəti illərdə isə ölkədə orqanik pomidor istehsalı artırılması və ekoloji təmiz pomidor istehsalına başlayan "Bakı Aqropark" ASC-nin bu sahədəki təcrübəsi yayılması məqsədəuyğun olardı(10).

Respublikamız dünyada pomidor ixracına görə seçilən ölkələr sırasında olsa da, yerli pomidor tələbatın bir hissəsi idxal məhsulları hesabına ödənilir. 2017-ci ildə ölkəmizə müxtəlif ölkələrdən ümumilikdə 2 milyon ABŞ dolları dəyərində və ya 4 min ton pomidor idxal edilmişdir.




**Şəkil 7.** Azərbaycana 2013-2017-ci illər üzrə pomidor idxalı(4)

Pomidor idxalının təhlili onu göstərir ki, ölkəmizə pomidor ixrac edən əsas ölkələr Türkiyə və İran İslam Respublikasıdır. Beynəlxalq Ticarət mərkəzinin statistik məlumatlarına əsasən ölkəmiz 2017-ci ildə pomidor ticarətində müsbət ticarət balansına sahib olmuşdur. Ümumilikdə dünya üzrə pomidor ticarətinə görə ticarət balansımız müsbət olmuşdur.

Şəkildən də göründüyü kimi Azərbaycana pomidor idxalı cüzidir. Digər tərəfdən Azərbaycanda idxal olunan pomidorlar üçün 1 kiloqram idxal rüsumu 0,4 ABŞ dolları təşkil edir. Bu isə daxili bazarda yerli istehsalçılara əlavə üstünlük verir.




**Şəkil 8.** Pomidor ixrac və idxalının müqayisəsi, 2013-2017, min ton

Bu sahədəki araşdırmamız isə onu göstərir ki, qarşıdakı illərdə də pomidor Azərbaycanda meyvə-tərəvəz ixracında mühüm yer tutacaqdır. Şübhəsiz ki, pomidor istehsalının və ixracının artırılması isə Strateji Yol Xəritəsində (1) qeyri-neft sektoru üzrə ixracın 2025-ci ildə adambaşına ən azı 450 ABŞ dollarına qaldırılması hədəfinin reallaşmasına töhfə verə bilər.

**Nəticə və təkliflər**

Yekun olaraq qeyd edə bilərik ki, 2017-ci ildə qeyri-neft sektoru üzrə ən çox ixrac edilən məhsul 151,6 milyon ABŞ dolları dəyərində pomidor olmuşdur pomidor ixracı artmışdır. Eyni zamanda daxili bazar yerli istehsalla tam təmin olunmuş və idxal aradan qaldırılmışdır.

Araşdırmamız göstərir ki, qarşıdakı illərdə pomidorun ixrac potensialını da artırmaq mümkündür. Çünki hazırda ölkədə 400 hektardan çox sahədə istixanalar tikilir. Bu isə ölkədə pomidor istehsalının növbəti illərdə də artacağını və böyük ixrac potensialı yaranacağını göstərir. Amma bu zaman qarşıda duran əsas problemlərdən biri pomidor ixracının Rusiya bazarlarından asılılığıdır. Düzdür araşdırmamız göstərir ki, Azərbaycan pomidoru Rusiya bazarında rəqabətqabiliyyətlidir. Lakin yalnız Rusiya bazarından asılılıq bəzi təhlükələr yaradır. Beləliklə, Rusiyanın hər hansı bir səbəbdən bu məhsulun idxalına məhdudiyyət qoyduğu təqdirdə Azərbaycanın pomidor ixracatçıları ciddi şəkildə zərərlə üzləşə bilər. Onun üçün də pomidor ixracının şaxələndirilməsi istiqamətində işlər sürətləndirilməlidir. Xüsusən də Körfəz ölkələrinə bu məhsulun ixrac imkanları öyrənilməlidir. Həmçinin Azərbaycanda orqanik pomidor istehsalına diqqət artırılmalıdır. Çünki ölkəmiz orqanik pomidor istehsalını təşkil etməklə Avropa Birliyi ölkələrinin

də bazarına məhsul təklif edə bilər. Eyni zamanda pomidorun emalının da inkişaf etdirilməsi zəruridir. 2017-ci ildə Azərbaycandan ixrac edilən pomidorun 99 faizi emal olunmamış pomidor təşkil etmişdir. İxracda emal olunmuş pomidorun payının artırılması zəruridir. Doğrudur ölkədə Qafqaz Konserv Zavodu(11) kimi müəssisələr pomidor emalı ilə məşğul olur. Amma növbəti illərdə pomidor istehsalının artacağı da nəzərə alınaraq, bu sahədə fəaliyyət genişləndirilməlidir. Pomidor emalını dərinləşdirməklə ölkəyə daha çox valyuta gətirməyə, həm də ixracı şaxələndirməyə nail olmaq mümkündür.

**ƏDƏBİYYAT**

1.Azərbaycan Respublikasında kənd təsərrüfatı məhsullarının istehsalına və emalına dair Strateji Yol Xəritəsi. /Azərbaycan Respublikası Prezidentinin 2016-cı il 6 dekabr tarixli Fərmanı ilə təsdiq edilmişdir/- http://www.president.az/articles/22110 2.Hüseyn R.Z. Aqrar sahədə rəqabətqabiliyyətli məhsul istehsalı: qloballaşmanın çağırışları və inkişaf imkanları. Bakı: 2018, «Avropa» Nəşriyyatı, 408 s. 3.Azərbaycan Respublikasının Prezidentinin saytı/- https://president.az/articles/26147 4.Azərbaycan Respublikası Dövlət Statistika Komitəsi/- https://www.stat.gov.az 5.Azərbaycan Respublikası Dövlət Gömrük Komitəsi/- http://customs.gov.az/az/faydali/gomruk-statistikasi/ 6.Azərbaycan Respublikası İqtisadiyyat Nazirliyi/- http://economy.gov.az. Azərbaycan Respublikası Kənd Təsərrüfatı Nazirliyi/- http://agro.gov.az www.trademap.org. http://www.worldstopexports.com/tomatoes-exports-country/. www.tomat.az . www.qafqazkonserv.az/products.html

**Оценка текущей ситуации экспорта томатов в Азербайджане**

**С.Н.Валиева**

Азербайджанская Республика была на первом месте среди стран, которые быстро увеличивают экспорт томата в мире. В 2017 году заняла 13-е место среди 15 стран с самым высоким доходом в этом секторе. Поддерживая 1,7% рынка в мировом экспорте томатов, Азербайджан является лидером среди экспортеров томата в Россию. Исходя из этого увеличения, помидор оказался на вершине экспортных ненефтяных продуктов. В 2017 году 9,9 % ненефтяного экспорта Азербайджана было представлено томатами, с увеличением стоимости на 61% и увеличением объема на 52%. Несмотря на то что существует положительная тенденция увеличения экспорта томатов, это также указывает на опасность зависимости от российского рынка. Автор оценивает текущую ситуацию с экспортом томатов и предлагает предложения по соответствующей диверсификации и увеличению экспорта.

***Ключевые слова:*** *ненефтяной сектор, фрукты и овощи, помидоры, экспорт, импорт, конкурентоспособность.*

**Evaluation of Current Situation of Tomato Export in Azerbaijan**

**S.İ.Valiyeva**

The Republic of Azerbaijan was on the top of the list among countries that rapidly increases tomato export world widely and ranked as 13$^{th}$ among 15 countries with highest income in this sector in 2017. By maintaining 1.7 percent market share on global tomato export, Azerbaijan is the leader among tomato exporters to Russia. Based on this increase tomato was on the top of the exported non-oil products. Thus, 9.9% of the non-oil exported products in 2017 was consisted of tomato with 61% increase in value and 52% increase in volume. Although, there is a positive tendency on the increase of tomato export, it also signals the danger of dependency on Russian market. The author of this article evaluates the current situation of tomato export and proposes suggestions on corresponding diversification and increase.

***Key words:*** *non-oil sector, fruits and vegetables, tomatoes, exports, imports, competitiveness.*